# TÖVHİD KƏLMƏSİNİN TƏFSİRİ

Müəllif:
Şeyxulislam
Mücəddid Alləmə Muhəmməd İbn Əbdülvəhhab ət Təmimi ən Nəcdi
(vəfatı: 1206 Hicri 1791 Miladi)

Şərh
Alləmə Şeyx
Salih ibn Fovzan ibn Abdullah əl Fovzan



تفسير كلمة التوحيد

# Təfsiru kəliməti ət təvhid

# TÖVHİD KƏLMƏSİNİN TƏFSİRİ

*Müəllif: Şeyxulislam Mücəddid Alləmə*

**Muhəmməd ibn Əbdülvəhab**

*ət Təmimi ən Nəcdi*

*(vəfatı: 1206 Hicri 1791 Miladi)*

**Şərh**

**Alləmə Şeyx**

**Salih ibn Fovzan ibn Abdullah əl Fovzan**

**Tərcümə edən**

**Əbu Əbdurrahmən**

بسم الله الرحمن الرحيم

# MƏTNI VƏ ŞƏRHİ

---

**Mətin :**

وسئل رحمه الله، عن: معنى: " لا إله إلا الله " فأجاب: اعلم رحمك الله، أن هذه الكلمة، هي الفارقة بين الكفر والإسلام، وهي: كلمة التقوى، وهي: العروة الوثقى، وهي: التي جعلها إبراهيم عليه السلام:

''كلمة باقية في عقبة لعلهم يرجعون" الزخرف: 28

**Şeyxulislam Mücəddid Imam Muhəmməd İbn Əbdülvəhabın, "lə ilahə illə Allah" ın mənasının nə olduğu soruşuldu. Şeyx (Allaha ona rəhm etsin) bu sözlərlə cavab verdi:**

**Allah sənə rəhm etsin, bil ki: Bu kəlmə, küfr ilə İslamı ayıran bir kəlmədir. O, təqva kəlməsidir və urvatul vusqadır (heç vaxt qopmayan sağlam bir qulpdur). Həmçinin də o kəlimə, İbrahimin ﷺ, özündən sonra gələnlərə, bəlkə dönərlər deyə buraxdığı kəlmədir.(Zuxruf 28)**

---

**Şərh:**

Rəhman və Rəhim olan Allahın adı ilə..

Həmd yalnız Allaha məxsusdur. Allahın Rəsuluna ﷺ, ailəsinə və əshabına salat və səlam olsun. "Lə iləhə illə Allah" kəlməsi əzəmətli bir kəlmədir. Dildə Asan tələffüz olunan, tərəzidə isə böyük və ağırdır olan bir kəlmədir. Çünki o, həqiqətdə İslamın mənası və mahiyyətinin anlamıdır. Yalnız, bu kəlmə sadəcə tələffüzdən ibarət deyildir. Əksinə onun bir mənası, bir həqiqəti vardır. Yenə onun rukunları və bilinməsi vacib olan şərtləri vardır. Əgər onun söylənməsində ki məqsəd, sadəcə bir tələffüzdən ibarət olsaydı, o zaman onu söyləyən hər kəsin müsəlman olması lazım labüd olardı. Çünki "Lə iləhə illə Allah" kəlməsini söyləmək olduqca asandır. Beləcə də bu kəlmənin sahibi, heç bir əməl etmədən müsəlman olardı.

Ancaq, bu kəlmə olduqca əzəmətlidir. Çünki, onun bir mənası, tələbləri, rukunları və həyata keçrilməsi olduqca çətin olan şərtləri vardır. Və elə bu səbəbdən də bu kəlmə, ancaq bir az öncə zikr etdiklərimə əməl olunarsa fayda verər.

Bu kəlmənin bir çox isimləri vardır. İxlas kəlməsi də bunlardan biridir. Çünki o, Allah Əzzə və Cəlləyə şirk qoşmağı ortadan qaldırır və ibadəti Allaha məxsus edir. Bu və bunun kimi səbəblərdən İxlas kəlməsi; Yəni, tövhidin heç bir şeylə qarışmaması, ibadətin xalis Allaha olması və Allaha şirk qoşulmaşından uzaqlaşdıran bir kəlmə olaraq başa düşülməlidir.

Digər Adı isə Təqva kəlməsidir. Necə ki bunu Uca Allah buyurmuşdur:

**"Kafilər öz ürəklərində cahiliyyə təkəbbürlüyünü və təəssübkeşliyinə qapandıqları zaman Allah, Rəsuluna ﷺ və möminlərə Öz dərgahından arxayınlıq göndərmiş və onlara təqva kəlməsində sabit etmişdir. Onlar bu sözə (başqalarından) daha layi idilər. Allah hər şeyi biləndir." ( Fəth 26)**

Təqva Kəlməsi, "Lə iləhə illə Allah "şəhadətidir. Ona təqva, yəni qorunub çəkinmə kəlməsi deyilmişdir. Çünki o, ixlaslı olaraq Allah üçün onu söyləyən kimsəni cəhənnəmdən qoruyur. Ona Təqva Kəlməsi deyilməsinin digər bir səbəbi də budur: Çünki o, yaxşı əməllər edilməsini tələb edir. Əslində Təqva, xeyir əməllər və itaətlər deməkdir. Bu kəlmədə bütün xeyir əməllər və itaətlər cəm olmuşdur. O halda o, Təqva Kəlməsidir.

Yenə o kəlmə, əl Urvatul Vuskadır. Necə ki, Uca Allah buyurur:

**"Və kim tağuta küfr edib Allaha iman edərsə, məhz o, (Urvatul Vusqaya), heç vaxt qopmayan sağlam bir ipdən yapışmışdır. Allah eşidən və biləndir." ( Bəqərə 256)**

Tağuta küfr edib, Allaha iman etmək; Bax "Lə iləhə illə Allahın" əsil mənası da elə budur. Tağuta küfr etmək: **"Lə iləhə"**nin mənasıdır. Allaha iman etmək də: **"illə Allahın"** mənasıdır. O halda tağuta küfr edib Allaha iman etməyin mənası, **"Lə iləhə illə Allahın"** tələblərindəndir. Bu səbəbdən də əl **"Urvatul Vusqa"** olaraq adlandırılmışdır.

Həmçinin də o kəlmə, Şeyxin də buyurduğu kimi küfr ilə İslamın arasını ayıran əlamətdir. Buna görə hər kim o kəlmənin, mənasını bilərək və tələblərini yerinə yetirərək söyləyərsə Müsəlman olar.

Hər kim də onu söyləməkdən üz çevirərsə və ya, söyləyər yalnız, mənasını bilməzsə və ya, söylər amma o kəlmənin şərtlərinə lazımınca əməl etməzsə, mənasını bilənə qədər, zahirən və batınən, lazımınca əməl edənə qədər Müsəlman olmaz!

Bunlar **"Lə iləhə illə Allahın"** adlarıdır. İxlas Kəlməsi, Təqva kəlməsi, əl Urvatul Vusqa, Küfürlə İslamın arasını ayıran kəlmə. İnsanların çoxu bu kəlmənin tələblərini yerinə yetirməyə çalışmırlar. Lakin bununla yanaşı onu çox-çox söyləyərək, onunla Allahı zikr etməkdə davam edirlər. Məsələn sufilər və başqaları. Onların, içərisində min dəfə və daha çox **"Lə iləhə illə Allahı "** sabah və axşam davamlı olaraq zikr edənlər vardır. Ancaq bununla yanaşı Allahdan başqasına yalvarıb-yaxarmağa davam edirlər. Belə olduğu halda o, kəlmə onlara heç bir fayda verməz. Çünki onlar, onun tələblərinə və şərtlərinə əməl etmirlər. Doğrudur, onu söyləyirlər, zikrləri əsnasında onu oxuyarlar və təkrar edirlər. Ancaq bununla yanaşı ölülərə yalvararaq, qəbirlərdən kömək istəyərlər.

Onlar, Allah və Rəsulunun əmr etmədiyi əməlləri özlərinə şəriət edən təriqət şeyxlərinə itaət edirlər. Bununlada Şəriəti Rəsulullahdanﷺ deyil, öz şeyxlərindən alırlar. Baxmayaraq ki, gecə gündüz **"Lə iləhə illə Allahın"** söyləyirlər. Bu zikrləri

onlara heç bir savab vermir və onlara heç bir faydası da yoxdur.

Həmçinin sufilərdən bəziləri də onu tam olaraq söyləməzlər. Heç bir əsası olmadan özlərini seçilmiş bir təbəqə olduqlarını zənn edərlər. Onlar **"Lə iləhə illə Allahın"**, söyləməyərək; "Allah, Allah" deyərək zikr edərlər. Onların zikrləri budur. Allah, Allah, Allah deyə təkrar edərək davam edərlər. Ancaq bu heç bir məna verməz. Halbuki onun mənasını bir cümlə olaraq söyləmək vacibdir. Allah, Allah söyləməyə gəlincə, bu sadəcə Allahın isimlərindən biridir və bu şəkildə təkrarlanması bir məna ifadə etməz. Bəzılərı Allah belə söyləməz. O ismi qısaldaraq Hu, Hu, Hu deyərlər. Halbuki bu, ('o' deməkdir) qeybdə olan üçüncü şəxsin təkinə aid olub tam bir fikir ifadə etmədiyi üçün heç bir məna verməz. Əslində isə bu əməl, bu isimlə oyun oynamaqdır. Buna görə də, bu cür məsələləri bıyan etmək vacibdir. Çünki şeytan **"Lə iləhə illə Allah"**, kəlməsinin "İslam Kəlməsi" olduğunu bildiyində və insanların arasında da onu söyləməyə və onunla zikir etməyə rəğbətin olduğunu görüncə, onları bu cür hiylələr ilə, bu kəlmədən uzaqlaşdıraraq, onları bu kəlməni söyləməkdən məhrum etdi. Onlara yaxınlaşaraq bu cür vəsvəsə etdi: **"Allah, Allah deyin və ya Hu, Hu deyin**". Onların bəzılərı isə, nə Allah nə də Hu deməz, bu kəlmələri sadəcə qəlbləri ilə söyləyərlər. Bunların hamısı şeytanın oyunudur. Bu səbəbdən də bu məsələləri bəyan etmək lazımdır.

Şeytan insanların bir qısmini də "**Lə iləhə illə Allah**" söyləməkdən mütləq olaraq qafil etdi. O kəlməni ancaq nadir hallarda söyləyərlər. Onunla Allahı çox az zikr edərlər. Kitabu Tövhiddə də zikr olunduğu kimi, tərəzidə olduqca ağır olduğu halda onu təkrar etməzlər.

Hətta o kəlmə, tərzinin bir tərəfinə qoyulduqda bütün göylər və Allah istisna olmaq üzrə göydəkilər, yer üzü və üzərindəkilər tərəzinin digər tərəfinə qoyulsa "**Lə iləhə illə Allah**" onlardan ağır gələr. O halda o kəlmə, göylərdən və Allah istisna olmaqla orada olanlardan, yerdən və orada olanlardan daha ağırdır. O çox əzəmətli bir kəlmədir. O kəlməni yalnız, Allahın müvəffəq etdiyi kimsələr, təkrarlayar və zikr onu söyləməyə daima fikir verərlər. Dilini onu söyləməyə və təkrar etməyə alışdıranlar isə olduqca azdırlar.

"**Lə iləhə illə Allah**", İbrahimin onun haqqında bu sözləri söylədiyi kəlmədir. **"xəbəriniz olsun ki mən, məni yaradandan başqa, sizin digər bütün ibadət etdiklərinizdən uzağam." Zuxruf, 26-27**

Deməк ki, "**Lə iləhə illə Allah**" mənası budur. **"Digər bütün ibadət etdiklərinizdən uzağam."** Bu "**Lə iləhə**" inkarın etməyin mənasıdır; **"məni yaradan istisna olmaqla** "isə "**illə Allahın**" yəni isbat etməyin mənasıdır. Uca Allah daha sonra buyurur:

**"Onu özündən sonra gələnlərə (yəni zürriyyətinə) qalıcı bir kəlmə etdi." Zuxruf 28**

Beləcə onların arasında "**Lə iləhə illə Allah**" söyləyənlər həmişə oldular. Yəni hamısı birdən onu tərk etmədilər. Yəni hamısı birdən şirk qoşmadılar. Əksinə aralarında onu söyləyənlər və onun üzərində sabit qalanlar az olsalar da və ya tək-tük də olsalar daima oldular. Muhəmməd ﷺ göndərildiyi zaman isə məhz bu kəlmə ilə göndərildi.

Rəsulullah ﷺ buyurur: "**Mənə insanlar "Lə iləhə illə Allah" deyənə qədər onlarla vuruşmaq əmr olundu. Elə ki, onu söylədilər o zaman, o kəlmənin haqı müstəsna məndən canlarını və mallarını qorumuş oldular. Hesabları isə Allaha qalmışdır.**"

O halda Rəsul ﷺ "**Lə iləhə illə Allah" kəlməsi** ilə göndərilmişdi və bu kəlmə, babası İbrahimin ﷺ özündən sonra gələnlər üçün qoyduğu kəlmədır. Muhəmməd ﷺ də, İbrahimin ﷺ özündən sonra gələnlərdən biridir. Allah onu, insanları bu kəlməyə dəvət etməyə və bu kəlmənin tətbiq olunması üçün, cihad (ona əməl etməyənlərə qarşı) edilməsi üçün göndərmişdir. Bu kəlmə əzəmətli bir kəlmədir. Ayənin davamında isə, **"Bəlkə dönərlər."** deyərək buyurmuşdur. Yəni, bu kəlməyə dönərlər.

Muhəmmədin ﷺ göndərilməsi ilə, İbrahimin ﷺ nəslindən olduqca çox insanlar o kəlməyə geri döndülər. Bəli! Rəsul ﷺ bu kəlmə ilə; Ona dəvət etmək, onu həyata keçirmək və onunla əməl etmək üçün göndərilmişdir. Hətta rəsulların hamısı onunla göndərilmişdir.

Uca Allah buyurur:

**"And olsun ki, biz artıq hər ümmətə: "Allaha ibadət edin və Tağutdan da çəkinin" deyən bir Rəsul göndərdik." Nəhl 36**

Demək ki, **"Lə iləhə illə Allah"** ın anlamı budur: **"Allaha ibadət edin, Tağutdan da çəkinin."** Bu (şəhadət kəlməsinin sütunu olan) inkar və isbatın mənasıdır.

Necə ki Uca Allah buyurur;

**"Səndən öncə elə bir Rəsul göndərmədik ki ona, məndən başqa haqq ilah yoxdur. O halda yalnız mənə ibadət edin deyə, vəhy etmiş olmayaq." Ənbiya 25**

**"O qullarından (yəni Nəbi və Rəsullardan) dilədiyinə öz nəzdindən bir ruh ilə mələklər endirir ki, bu həqiqəti dilə gətirib qoxutsunlar: "Məndən başqa haqq ilah yoxdur. O halda məndən qorxub çəkinin." Nəhl 2**

Rəsulların hamısı **"Lə iləhə illə Allah"** ilə göndərilmişdir. Ancaq İbrahim ﷺ , onu özündən sonra gələnlərə qıyamətə qədər qalıcı bir kəlmə olaraq miras qoymuşdur. Çoxları üz çevirsələr də, İbrahimin zürriyyətindən bu kəlməni bilənlər, ona əməl edənlər və onu həyata keçirənlər sayəsində, bu kəlmə heç vaxt tərk olunmadı.

---

**Mətin :**

**وليس المراد: قولها باللسان مع الجهل بمعناها**

**Bu kəlimə ilə tələb olunan, onun mənasını bilmədən, onu sadəcə dili ilə söyləmək deyildir.**

---

**Şərh:**

"**Lə iləhə illə Allah** "sözü ilə qəsd edilən, mənasını bilmədən, onu sadəcə dili ilə söyləmək deyildir. "**Lə iləhə illə Allah"**ın mənasını öyrənmək bir vəzifə borcundur. Mənasını bilmədiyin halda onu söylədiyin zaman, şübhəsiz ki onun dəlalət etdiyi mənalara etiqad etməyin də mümkün deyildir. Çünki, bilmədiyin bir şeyə necə etiqad edə bilərsən ki? O halda ona iman etmiş sayılmaq üçün, mütləq onun mənasını bilmək lazımdır. Yalnız bu şəkildə dilinlə söylədiyinə qəlbinlə də iman etmış sayılarsan. Bu səbəbdən "**Lə iləhə illə Allah"**ın mənasını öyrənmək mütləq olaraq fərzlərdəndir. Mənasını bilmədən onu sadəcə dil ilə söyləməyə gəlincə, bunun onu söyləyənə heç bir faydası yoxdur. Həmçinin də qəlbi ilə etiqad edərək, dili ilə söyləmək də (müsəlman olması üçün) yetərli deyildir. Əksinə o kəlmənin tələblərinə əməl etməlidir. Bu da, ibadəti yalnız Allaha xas etməklə və ondan başqasına ibadəti tərk etməklə mümkündür. O halda "**Lə iləhə illə Allah** "deyən kimsə, o şəhadətin mənasını bilməli və ona əməl etməlidir. Deməli bu kəlmə, yalnızca tələffüz kəlməsi deyildir.

**Murciyalara görə isə: "Lə iləhə illə Allah"-ı tələffüz etmək yetərlidir" və ya "Mənasına etiqad edərək onu tələffüz etmək yetərlidir, əməl mütləq şəkildə vacib deyildir. Hər kim onu söyləyərsə, istərsə onun şərtlərindən heç bir şeyə əməl etməsin**

**O, cənnət əhlindəndir. İstərsə namaz qılmasın, zəkat verməsin, həccə getməsin, oruc tutmasın, pis əməllər və böyük günahlar etsin, zina etsin, oğurluq etsin, içki içsin, istədiyi bütün üsyan və günahları etsin, bütün itaətləri tərk etsin."** Çünki onlara görə "**Lə iləhə illə Allah**" söyləmək yetərlidir.

Məhz əməlləri imanın həqiqətindən çıxaran mürciya məzhəbi budur. Əgər əməli olarsa daha yaxşı olar deyərək bildirirlər. Əgər əməli olmazsa da, onlara görə "**Lə iləhə illə Allah**" demək yetərlidir. Onlar ; **"Hər kim Lə iləhə illə Allah deyərsə cənnətə girər"** şəklində varid olan hədislərin mənasını zahirini götürürlər. Halbuki, Rəsulullahın ﷺ məsələləri, yalnız bu hədislərlə bağlamamışdır. Bəli; Rəsulun ﷺ bu cür sözlərini izah edən başqa hədisləri də mövcuddur. Biz Rəsulun ﷺ sözlərinin bir qısmını digər qisimləri ilə cəm etmək məcburiyyətindəyik.

Hədislərin bir qismini götürüb digər qisimlərini isə tərk etmək olmaz. Çünki, Rəsulun ﷺsözlərinin bir qismi digər bir qismini təfsir edir. Bir qismi digər qismini açıqlayır. Bir tərəfini alıb, digər tərəfini tərk edənə gəlincə şübhəsiz ki, bu cür insanlar, qəlblərində əyrilik olan və Uca Allahında bildirdiyi kimi olanlardır;

**"Fitnə çıxarmaq və (batinlərinə müvafıq bir) təvili axtarıb tapmaq üçün onun mütəşabihinə tabe olanlardır." Al İmran 7**

Rəsulullah ﷺ **"Hər kim Lə iləhə illə Allah deyər və sonra Allahdan başqa ibadət edilənləri rədd edərsə"** buyurmuşdur. Bu hədis də səhihdir. O halda siz nə üçün, bu kənara qoyursunuz?

Başqa hədisdə isə bu cür buyurulmuşdur:

**"Şübhəsiz ki Allah Lə iləhə illə Allah deyən və bununla yalnız Allahın Üzünü (rizasını) isdəyən kimsəyə cəhənnəm haram edilmişdir."**

"**Lə iləhə illə Allah"** dediyi halda Allahdan başqa ibadət edilənləri rədd etməyən, övliya və salehlərə dua edənə gəlincə, şübhəsiz ki, "**Lə iləhə illə Allah"** ona fayda verməyəcəkdir. Çünki Rəsulullahﷺın sözlərinin bir qismi, digərini təfsir edir. Yenə bir başqa sözləri də digərlərini izah edir. Bu səbəbdən də, bu kəslərin (hədislərdəki) bir qisim sözləri alıb, digər qismini tərk etməkləri doğru deyildir.

Uca Allah buyurur:

**"Sənə bu əzəmətli kitabı endirən Odur. Onun bir kismi möhkəm ayələrdir ki, onlar kitabın əsasını təşkil edir. Digərləri də mütəşabihdir. Fəqət qəlblərində xəstəlik olanlar, sadəcə onun mütəşabihlərinin arxasınca düşərlər." Əli İmran 7**

Onlara sərf edənləri götürür və sərf etməyənləri isə tərk edirlər. Həmçinin də deyirlər ki;

"Biz Qurandan dəlil gətiririk."

Bizdə deyirik ki;

"Siz Qurandan dəlil gətirmirsiniz. Quran bir ayədə bu cür deyirsə, başqa ayələrdə də, bu cür buyurmuşdur." Nə üçün sizlər bir qismi qəbul edib, digər qismini tərk edirsiniz?

**"Elmdə möhkəmlənib dərinləşənlər isə deyərlər ki; Biz ona (Qurana) iman etdik. Hamısı Rəbbimizin nəzdindəndir." Əli İmran 7**

Yəni möhkəm ayələrə də, mütəşabih ayələrə də etiqad edərlər. O halda mütəşabihləri, möhkəmlərlə izah etmək lazımdır. Və möhkəm olan ayələri, mütaşabihlərlə qeyd altına alınır və onunla da təfsir edilir. Onlar isə möhkəm ayələri tərk edərək, mütəşabih ayələri götürürlər. Bax elə bu da, qəlblərində xəstəlik olanların yoludur. O halda Rəsulullahın ﷺ buyurduğu:

**"Hər kim Lə iləhə illə Allah deyərsə cənnətə girər."** Hədisini alıb onunla kifayətlənən, digər hədislərdəki qeydlərə və digər açıqlayıcı sözlərə dönməyən kimsələr, qəlblərində əyrilik olan əhli zeyğlərdir.

<u>Bu böyük qaydanı qavramaq elim tələbəsi üçün fərzdır</u>. Çünki bu, dini bütünlüklə özündə cəm edən, xüsusi bir qaydadır. Bir ayəni və ya bir hədisdən yapışıb, ondan başqasını isə tərk etmək, örnək tutulan bir yol deyildir. <u>Əksinə məqsəd edilməsi lazım olunan iş, Quranı və Sünnəti bütünlüklə, həm də tam olaraq almaqdır. Elim əhlinin sözləri də belədir</u>. Alim bir söz söylədiyi zaman bu söz, digər sözlərə qaytarılmalı və cəm olunduqdan sonra alınmalıdır.

Və heç vaxt bir söz tək başına alınmamalıdır. Alimin sözləri, əsərləri içərisindən seçərək araşdırılmadır. Çünki alimin sözlərinin bir qismi digər qismini aşıqlayır. Çünki onlar da, Allahın Kitabında kı kimi və Rəsulunun Sünnətindəki kimi olan yolu izləyirlər.

Məqsəd onların da sözlərindən mütləq olanları, qeyd olunanlara döndərməkdir. Məhz bu səbəbdən elim tələbəsinə, bu qaydanı davamlı olaraq ağlında tutaraq, Kitab, Sünnət və elm əhlinin sözlərindən sərf edənləri alıb, sərf etməyənləri isə tərk edərək, nasları [əsil mənasından] kəsib doğrayaraq, sözlərin çoxunu tərk edərək, onları götürməyən və ya birinci sözü açıqlayan, ikinci sözü buraxaraq açıqlamayan, mütəşabih sözləri götürüb, açıq aydın sözləri buraxan, qəlblərində xəstəlik olan əhli zeyğin yolundan uzaq durmaq fərzdır.

İnsanlar, ya azdırmaq məqsədi ilə, ya da cəhaləti səbəbi ilə, özünü elim əhli kimi qələmə verənlərin çoxu, bu qaydaları etmişlərdir. O halda, bu məsələlərin bilinməsi və elim tələbəsinin nəzdində əsas bir qaydaya dönməsi fərzdır.

---

**Mətin:**

**فإن المنافقين يقولونها وهم تحت الكفار في الدرك الأسفل من النار**

**Şübhəsiz ki, münafiqlər də o kəlməni söyləyirdilər, buna baxmayaraq onlar, kafirlərin də aşağıda, “cəhənnəmin (dibində) ən aşağı təbəqəsındədırlər.” Nisa 145** [1]

---

**-----------------------------------------------------------------------------**

[1] **Şeyxulislam Muhəmməd ibn Əbdülvəhhab rəhiməhullah başqa bir**

**yerdə bu şəkildə buyurmuşdur: Lə iləhə illə Allahın həm ləfzı, həm də mənası vardır. Ancaq insanlar onu söyləməkdə üç qrupdurlar:**

**Birincilər onu söyləyər, haqqını verər, bir mənası olduğunu bilir, onunla əməl edər və onu pozan şeylərin nə olduğunu bilib onlardan çəkinərlər.**

**İkincilər, zahirində onu söyləyər, zahirlərini onunla bəzəyər (saqqal, isbal və s,), batınlərində isə küfr və şübhələr gizləyərlər.**

**Üçüncülər gəlincə, onu söyləyər ancaq, onun mənasının həqiqətinə əməl etməzlər və onu pozan əməlləri edirlər. Məhz belələri Allahın haqlarında: "Onlar dünya həyatında əməlləri boşa gedənlərdir. Halbuki etdiklərinin yaxşı əməllər olduğunu zənn etməkdədirlər." Kəhf 104-də deyilən kimsələrdir.**

**Birincilər: Nicat tapanlardır, onlar həqiqi möminlərdir.**

**İkincilər: Münafıqlərdır.**

**Üçüncülərə: Gəlincə isə, onlar müşriklərdir.**

**Lə iləhə illə Allah bir qaladır. Ancaq onlar, təqzibləri ilə ona hərb elan etmişlər, onun surlarını və divarlarını məhv etmişlər; düşmənləri isə içlərinə girərək, onun mənasını onlardan çəkib almışlar və onları sadəcə o kəlmənin surəti ilə baş-başa buraxmışlardır. Hədisdə deyilir: "Şübhəsi ki, Allah sizin surətlərinizə və bədənlərinizə deyil, qəlblərinizə və əməllərinizə baxar." Lə iləhə illə Allahın mənasını onlardan qopararaq almışlar, onlarla isə boş-boşuna ağızları ilə tələffüz etdikləri quru bir sözdən və hərflərin toplumundan başqa bir şey qalmamışdır. Bu isə, qalanın anılması və düşmənə məğlub olunması deməkdir. O kəlmənin özünü isə başa düşmürlər. Bu sanki, odu xatırlayaraq od olmayacağını, suyu xatırlayaraq susuzluğun keçməyəcəyi, çörəyi xatırlayanın, aclığının keçməyəcəyi, qılıncı xatırlayaraq, kəsilməyəcəyi kimi, qalanın xatırlanması kimi də, onun qorunmamasının misalına bənzəyir. Söz onun qabuğu, mənası isə**

**içidir. Söz qabuq, məna isə incidir. Özü olmayan qabuğun, incisi olmayan sədəfin nə faydası var ki? "Lə ilahə illə Allahın" mənasının durumu ruhun bədəndəki yeri kimidir. Ruhsuz bədənin heç bir faydası olmadığı kimi, mənası olmayan kəlmənin də bir faydası olmaz." [Duraru Əsəniyə 2cild/112səh]** **Tərcümə edəndən........**

**Şərh:**

**"Münafiqlər "Cəhənnəmin (dibində), ən aşağı təbəqəsındədırlər." Nisa 145**

Onlar, (zahirlərində) İslamı izhar edib (batinlarində) küfrü gizləyənlərdir. Nəbi ﷺ Mədinəyə hicrət etdikdən sonra mühacir və ənsarlar, Onun ətrafında toplandılar və İslam qüvvətləndi. Bədir döyüşündə isə İslam zəfər çaldı. Bu böyük hadisənin xəbəri Şərqə və Qərbə çox sürətlə yayıldı.

Çünkı Nəbiﷺ , Qureyşin ürəklərinə qarşı zəfər qazanmışdı. Bildiyimiz kimi Qureyş, ərəblərın tacı idi. İnsanlar onları örnək ayırdılar. Rəsulullah ﷺ Bədirdə onlara qarşı zəfər qazanıb başçılarını öldürdüyü zaman, münafiqlər dedilər: "Biz artıq Mədinədə mühacir və ənsarın arasında qaldıq". Bu da bir tərəfə hələ aralarında rəsul da var.

Belə olduğu təqdirdə nə etmək lazımdır? Bir hiyləyə əl atdılar. Müsəlmanların arasında yaşadıqları üçün və qanlarını və mallarını qorumaq məqsədi ilə, İslamı izhar etdilər (İslama girdilər). Rəsulaﷺ düşən zahirə baxmaq idi. Qəlbləri isə Allahdan başqası bilməz. O halda kim Müsəlman kimi özünü (əməllərlə) göstərərsə, zahirinə müxalif (küfr və ya şirk) bir əməl izhar edənədək, ondan bunu (islamını) qəbul edərik.

Lə iləhə illə Allah dedilər. Zahirlərində Rəsulun ﷺ risaləsinə şəhadət etdilər.

Bu kəslər haqqında Allah buyurur:

**"Sənə gəldikləri zaman o münafiqlər belə dedilər: "Şəhadət edirik ki, əlbəttə sən, heç şübhəsiz Allahın rəsulusan." Allah bilirki əlbəttə sən heç şübhəsiz Onun rəsulusan. Bununla bərabər Allah şəhadət edir ki: Həqiqətən də münafıqlər yalançılardır. Onlar andlarını bir sipər etdilər." Münafiqun 1-2**

**"Sipər etdirlər"** yəni, özü ilə (şəhadət kəlməsi ilə) gizləndikləri bir qalxan etdilər. Məhz beləcə, Müsəlmanların qüvvətləndiyini görüncə, münafiqlər, zahirlərində İslama girdilər, gizlində isə Allah qorusun, küfr üzərində qaldılar. Bu səbəbdən də Allah onları müşriklərdən, bütpərəstlərdən, dinsizlərdən daha aşağıda, cəhənnəmin ən dibində qalacaq kimsələr etdi. Çünki, hiylələri və tələləri çox böyükdür. Bax gör Allah onlar barədə nələr deyir:

**"Guya Allahı və möminləri aldadırlar! Əslində isə onlar özlərindən başqasını aldatmırlar. Lakin bunu anlamazlar." Bəqərə 9**

Bilki, münafıq də Lə iləhə illə Allah deyir, bunu deməsinə baxmayaraq O, cəhənnəmin ən alt təbəqəsindədir. O halda necə ola bilər ki, "Lə iləhə illə Allahı" tələffüz etmək yetərlidir, deyirlər. Məgər bilmirlərmi ki, münafıqlər, cəhənnəmin ən dibində odluqları halda belə, onlar da "Lə iləhə illə Allah" deyirlər.

Bütün bu dəlillər də, qəlb ilə etiqad və orqanlarla əməl olunmadıqca o kəlməni sadəcə söyləmənin yetərli olmayacağına dəlalət etməkdədir.

---

**Mətin:**

**مع كونهم يصلون ويصومون، ويتصدقون ،**

**Bununla yanaşı onlar, namaz qılır, oruc tutur və sədəqələr verirlər.**

---

Şərh:

Münafıqlər, zahirlərində namazı, sədəqəni və s, izhar edirdilər. Rəsulullah ﷺ ilə birlikdə cihada gedirdilər. Ancaq onlar qəlblərində münafıq idilər. Baxmayaraq ki, “Lə iləhə illə Allah” da deyirdilər, ancaq bu onlara bir fayda vermədi.

---

**Mətin:**

**ولكن المراد: معرفتها بالقلب، ومحبتها ومحبة أهلها، وبغض من خالفها ومعاداته**

**Ancaq, onu söyləməkdə məqsəd; onu qəlbi ilə bilib qavramaq, ona və əhlinə sevgi bəsləmək, ona müxalif olana isə buğz edərək, düşmənçilik (izhar ) etməkdir.**

---

Şərh

Lə iləhə illə Allah şəhadətini söyləmək də məqsəd; onu dil ilə söyləmək, qəlb ilə ona etiqad etmək, tələblərinə isə əməl etməkdir. "Lə iləhə illə Allahın" əhli ilə dostluq edərək, o kəlməyə müxalif olanlara qarşı da, düşmənçilik göstərmək vacibdir. Bu da Allah üçün sevmək və Allah üçün nifrət etməkdir. Bunların hamısının cəmi isə "Lə iləhə illə Allahın" özüdür və həqiqətidir. Bu səbəbdən də elim əhli "Lə iləhə illə Allahın" yeddi şərti olduğunu bildirmişlər. Alimlərdən bəzisi də bu yeddi şərti bu cür saymışlardır.

1) **Elim**
2) **Yəqinlik**
3) **Ixlas**
4) **Sadiqlik**
5) **Qəbul**
6) **Inqıyad**
7) **Məhəbbət**

Şeyx Səəd ibn Atiq rəhiməhullah bunlara səkkizinci şərti də əlavə etmişdir. O da:

**8.Allahdan başqa ibadət edilən hər Tağutu rədd etməkdir.**

Lə ilahə illə Allahın iki rüknü vardır. Bunlar:

**1) İnkar.**

**2) İsbatdır.**

Özü özlüyündə nə inkar, nə də isbat faydalı deyildir. Hətta bunların ikisidə bir yerdə olmayana qədər, bu kəlmə fayda verməz.

---

**Mətin:**

كما قال صلى الله عليه وسلم " من قال لا إله إلا الله مخلصاً " وفي رواية: " صادقا من قلبه "
وفي لفظ: " من قال لا إله إلا الله، وكفر بما يعبد من دون الله "

**Necə ki, Nəbi ﷺ buyurmuşdur: "Hər kim ixlaslı olaraq "Lə iləhə illə Allah" deyərsə, başqa bir rəvayətdə: "qəlbi ilə doğrulayaraq deyərsə." başqa bir rəvayətdə: "Hər kim Lə iləhə illə Allah" deyər və Allahdan başqa ibadət olunanları inkar edərsə."**

---

Şərh

Göründüyü kimi hədislər şərtlərlə əlaqəli olaraq gəlmişlər. Rəsulullah, ﷺ hər kim sadəcə **"Lə iləhə illə Allah** deyərsə, deyib dayanmamış və daha sonra müxtəlif qeydlər etmişdir. Məsələn: "Qəlbi ilə doğrulayacağını" buyurmuşdur. Qəlbi ilə

ixlaslı olmadıqca insanın **"Lə iləhə illə Allah"** deməsi yetərli deyildir. Qəlbi ilə ixlasla söyləməlidir ki, onu dilləri ilə söyləyib, qəlbləri ilə söyləməyən münafıqlərdən fərqlənsin. Hər kim **"Lə iləhə illə Allah"** deyər və Allahdan başqa ibadət edilənləri rədd edərsə" hədisindəki şərt isə çox mühümdür. "Allahdan başqa ibadət edilənləri rədd edərsə." Çünki bir çox kimsələr **"Lə iləhə illə Allah" deyillər, lakin** qəbirlərə ibadət etməklə, ölülərə yalvarmaqla, onlardan kömək istəməklə, Allahdan başqalarından ehtiyaclarını tələb etməklə məşquldurlar. Və bu əməlləri tərk etmirlər. Məhz bu cür olanlar **"Lə iləhə illə Allah"** desələr belə, onlara bu şəhadətin, hər hansı bir faydası olmaz. Çünki onlar, Allahdan başqa ibadət olunanları rədd etmədilər.

---

**Mətin:**

**إلى غير ذلك من الأدلة الدالة على جهالة أكثر الناس بهذه الشهادة**

**Bu və bunun kimi bir çox hədislər, insanların çoxunun bu şəhadət kəlməsinin mənasından və həqiqətindən cahil qalmalarına dəlalət edir.**

---

**Şərh:**

İnsanlardan bir çoxu, bu şəhadətin həqiqətindən uzaq olaraq cəhalət içərisindədirlər. Onu sadəcə dilləri ilə söylədikləri bir söz hesab edirlər. Alimlərdən bir çoxları "Lə iləhə illə Allahın" mənasını anlayıb, dərk etmirlər. Belələri

fiqh elmində alim, Ərəb dili üzrə alim, hədis elmilərində alim olsalar da, onların çoxu tövhidə ehtiram göstərməzlər. Belələrinin tövhidi, Rübubiyyət ilə qane olan Əşari aqidəsini və kəlam əhlinin əqidəsini öyrənməkdən ibarətdir.

Beləlləri **"Lə iləhə illə Allah"** deyər və onu, Allahdan başqa yaradan yoxdur, Allahdan başqa yoxdan var etməyə qadir olan və gücü yetən yoxdur deyərək, təfsir edərlər. Onların **"Lə iləhə illə Allah** "a dair təfsirləri sadəcə bundan ibarətdir. Tövhidi Rübubiyyətdən başqa heçnə danışmazlar.

Və **"Lə iləhə illə Allah** "ı təfsir edərkən rübubiyyət tövhidinə heç bir əlavə etməzlər. **"Lə iləhə illə Allahın"** isə tələb olunan tövhid olduğu barəsində kəlmə belə danışmazlar.

Kəlamçıların əqidələrini oxuyanda onların, Allahın varlığı barədə şübhələrin mövcud olması varmış kimi, sadəcə Onun mövcud olmasını isbat etməyə çalışarlar. Onun yaradan, ruzi verən, dirildən və öldürən olduğunun isbatına çalışdıqlarını görürsən. İbadəti isə heç vaxt zikr etməzlər. Üluhiyyəti əbədi olaraq ağızlarına belə almazlar. Onların kitablarında belə zikr etdikləri əqidə, müşriklərin dinləri ilə, heç bir xüsusda fərqlənməyən etiqaddır. Uca Allah müşrikləri zikr edərək, onların etiqadları barədə belə buyurur:

**"(Ey Rəsulum!) De ki: Sizi göydən və yerdən ruzıləndırən kimdir? Qulaqlara və gözlərə sahib olan kimdir? Ölüdən dirini, diridən də ölünü çıxardan kimdir, kainatda bütün işləri kim idarə edir? Onlar həmən: Allah, deyəcəklər." Yunus 31**

Deməkki onlar Allahı qəbul edirdilər, ancaq Ondan başqasına ibadət edirdilər.

**"Allah başqa özlərinə nə bir fayda nə də bir zərər verməyə qadir olmayan kəslərə ibadət edərlər . Sonra isə " Bunlar bizim, Allah nəzdində olan şəfaətçilərimizdir deyirlər." Yunus 18**

O müşriklər öz ilahlarına yaradan ruzi verən demirdilər. Onlar yalnız Allah nəzdində bizim üçün şəfaət tələb edənlər və Allah ilə aramızda vasitələr olduğunu deyirdilər. Bu xüsus olduqca təhlükəlidir. Bu məsəldə qarışıqlıq və şübhələr olduqca çoxdur. Bu qarışıqlıq və şübhələr səbəbindən insanların çoxu azmışdır.

Və görürsən ki, kim ixlasla tövhidə əməl edər və **"Lə iləhə illə Allah"**ın mənasını bəyan edərsə, "Bu insan Müsəlmanları təkfir edir." Deyərlər.

Müsəlmanları təkfir edənlərdən Allaha sığınırıq. Bizlər, Allah və Rəsulunun təkfir etdiklərindən başqasını təkfir etmirik (yəni qəbirlərə ibadət edənləri).

**"Lə iləhə illə Allahın** " tələblərini yerinə yetirməyənləri isə, Allah və Rəsulu təkfir etmişdir.

---

**Mətin:**

**واعلم: أن هذه الكلمة، نفي، وإثبات**

**Bil ki, bu kəlmə inkar və isbatdan ibarət olan bir kəlmədir.**

**Şərh:**

Bu kəlmənin iki rüknü vardır. Bu rükünlər, inkar və isbatdan ibarətdir. Özü-özlüyündə inkar kifayət olmadığı kimi, sadəcə isbat etmək də fayda verə bilməz. Məhz bu səbəbdən hər ikisnin də bir yerdə olması vacibdir. Uca Allahın bu əmri buna dəlildir:

**"Hər kim Tağuta küfr edib Allaha iman edərsə." Bəqərə 256.**

Uca Allah sadəcə "**Tağuta küfr edib**" demir bununla yanaşı, "**Allaha iman edərsə**"də buyurmuşdur. Sadəcə "Allaha iman edərsə" deyərək kifayətlənməyərək, tağuta küfr etməyi də şərt qoymuşdur. Demək ki, hər ikisinin də olması vacibdir.

**Mətin:**

**نفي الألوهية عما سوى الله تبارك وتعالى، من المخلوقات، حتى عن محمد صلى الله عليه وسلم وعن الملائكة، حتى جبرائيل، فضلا عن غيرهم، من الأولياء، والصالحين**

**Üluhiyyəti, Allah Təbərakə və Təaladən başqasına qadağan edilmişdir. Hətta bu qadağa Muhəmməd ﷺ və mələklərə, fəzilətindən asılı olmayaraq, Cəbrayilə belə qadağan edilmişdir.**

**Şərh:**

Məxluqatın ən salehləri olsa belə, Allahdan başqa ibadət edilməkdən şübhəsiz ki, qadağan edilmişdir. Bəşəriyyətin ən

salehi olan Muhəmməd, ﷺ mələklərin ən salehi olan Cəbrayıldır. Buna baxmayaraq bir insan Cəbrayıla və ya Muhəmmədə ibadət edərsə, cəhənnəmdə əbədi olaraq qalan bir müşrik olar. Çünki Allah özü ilə yanaşı, nə mələklərdən nə peyğəmbərlərdən, nə salehlərdən, nə daşlardan, nə də ağaclardan ibadət olunaraq ona şərik qoşulmaşından heç vaxt razı olmaz. Bu səbəbdən də Allah buyurur:

**"Rəbbinə ibadətində bir kəsi belə Ona şərik qoşma." Kəhf 110**

Bu ayədə **"bir kəsi belə"** deməsi, hər şeyi əhatə edən bir qadağadır. Digər ayədə isə Allah belə buyurur :

**"Allaha ibadət edin, Ona heç bir şeyi şərik qoşmayın." Nisa 36**

Bu ayədə isə "Heç bir şeyi" bildirmişdir bu da ümumi qadağan olub, qeyri müəyyənlikdə gəldiyi üçün, hər bir şeyi əhatə edərək, bütün şeylərin qadağası deməkdir.

---

***Mətin:***

**؛ إذا فهمت ذلك: فتأمل هذه الألوهية، التي أثبتها الله لنفسه، ونفاها عن محمد، وجبرائيل عليهما السلام، فضلا عن غيرهما من الأولياء، والصالحين، وأن يكون لهم مثقال حبة خردل**

**Əgər bu məsələləri başa düşə bildinsə; Onda Allahın öz nəfsi üçün isbat etdiyi üluhiyyəti, Muhəmmədə, Cəbrayilə və fəzilətindən asılı olmayaraq onlardan başqalarına, vəlilərə, salehlərə və digərlərinə sərf edilməsindən mütləq şəkildə**

**qadağan etməsini, və bu üluhiyyətdən xardal dənəsi qədər bir kimsəyə pay verməməsi barəsində diqqətlə düşün.**

---

**Şərh:**

Üluhiyyətin mənası ibadətdir. Məhz bu məqamda, "Lə iləhə illə Allahın" təfsiri barəsində bir çox insanların çaşqınlığa düşməsini, onun əsıl mənasından fərqli təfsirlər vermələrini bəyan etmək lazımdır:

**1) Vəhdətul Vücud əqidəsinin Tövhid Kəlməsinə verdikləri təfsir:**

**Vəhdətul Vücudçular**, yəni İbn Ərəbi və ona tabe olanlar bu şəkildə təfsir etdilər: **"Lə iləhə illə Allahın"** mənası budur: Allahdan başqa ibadət edilən yoxdur və ya Allah istisna heç bir ilah mövcud deyildir." Bu, ibadət edilənlərin hamısı Allahın özü olduğu mənasını bildirir. Çünki onlara görə varlıq, yaradan və yaradılan olaraq iki yerə ayrilmır. Varlıq Aləm bütünlüklə Allahın özüdür. Bu da o deməkdir ki: **Vəhdətul Vücudçular** varlığı tək bir varlıq olaraq görürlər və yaradanı, yaradılandan fərqləndirərək ayırmırlar. Varlığın özü onlara görə Allahdır. İnsan nəyə ibadət edirsə etsin, Allaha ibadət etmiş sayılar. Buzova ibadət edənlərin, bütə ibadət edənlərin, daşa ibadət edənlərin, insana ibadət edənlərin, mələklərə ibadət edənlərin hamısı, Allaha ibadət edirlər. Çünki Allah mütləq olan varlıqdır. Varlıqlar yaradan və yaradılan olaraq iki qısmə ayrılır deyənlərə isə; "Bu insan müşrikdir." Deyərlər. Onlara görə var olan aləm tək bir

şeydir, o da Allahdır" deməyənə qədər tövhid əhli ola bilməzsən. Bu aləmdə istər ağac, istər daş, istər büt, istər Tağutlar olsun, hər nəyə ibadət edirsən et, Allaha ibadət etmiş sayılırsan. Çünki bunlar Allahın özüdür.

Hərdən görürsən ki, avam insanlardan bəzi kimsələr xəta edərək belə deyirlər: "Allahım səndən başqa məbud yoxdur." Bu cur şəhadət Vəhdətul Vücudçuların görüşlərinə müvafiqdir. Doğru olan şəhadət isə;

"Allahım səndən başqa haqq məbud yoxdur " deyib, "haqq" kəlməsini əlavə edərsək mümkün olar! Çünki, Ondan başqa bütün məbudlar batildir. Baxmayaraq ki onlar mövcuddurlar. Amma haqq olan məbud yalnız Allahdır.

Uca Allah buyurur:

**"Şübhəsiz ki, bu belədir! Çünki Allah haqqın özü, Ondan başqa yalvardıqları isə batildir. Və Allah, (zatı ilə və sifətləri ilə) çox yüksək və çox böyükdür." Həcc 62**

**2 Kəlam Əhlinin Tövhid kəlməsinə verdikləri təfsir:**

Kəlamçılara görə : **"Lə iləhə illə Allah"hın mənası belədir:** Yoxdan var etməyə, yaratmağa, idarə etməyə, icad etməyə, Allahdan başqasının gücü çatmaz." Bu, doğru deyildir. Bu, müşriklərin dininə müvafiq olmaqdır. Çünki müşriklər də, "Allahdan başqasının yaratmağa gücü olmamasına, Allahdan başqasının diriltməyə qadir olmadığına, Allahdan başqasının öldürə bilməməsinə, Allahdan başqasının ruzi verməməsinə" etiqad edirdilər. Bu, Rübubiyyət tövhididir.[1]

---

**(1) Lə iləhə illə Allahı, insanların çoxu "Allahdan başqa ilah yoxdur." Kimi başa düşürlər. Lakin bilmək lazımdır ki, bu cür başa düşmək də Kəlam Əhlinə bənzəməkdir. Hətta bəziləri tamamı ilə inkar edərək "Allahdan başqa heç bir ilah yoxdur " deyirlər. Lə iləhə illə Allahı bu cur başa düşmək bəsit bir cahillikdir. Allahdan qeyri haqqı olan ilahın olduğunu qəbul etmək isə mürəkkəb bir cahilliyə dəlalət edir. Çünki ilah, haqq olsun batil olsun bütün ibadət edilənlərin adıdır. Və "Allahdan başqa heç bir ilah yoxdur" deyilərsə ilahların hamısını rədd etmiş sayılar. Halbuki ki günəş kimi açıq və aydın bilinən bir məsələ olmasına rəğmən, batıl ilahların varlığını inkar etmək, Allahın bu barədə verdiyi xəbərləri inkar etməkdir. Necəki Uca Allah buyurur:**

**" O halda Allahdan başqa heç bir ilaha əsla yalvarma! Hətta əzab edilənlərdən olmayasan." Şuara 213**

**" Hər kim Allahdan başqa başqa bir ilaha yalvararsa" Muminun117**

**" O kəslər ki Allahdan başqa bir ilahı çağıraraq ona yalvarmazlar." Furqan 68**

**" Allahdan başqa başqa bir ilahı çağırma!" Qasas 88**

**" Allahdan başqa bir ilahdan tutnma! Yoxsa qınanılan və tərk edilən olaraq qalanlardan olarsan. Rəbbin özündən başqasına ibadət etməməyinizi sizlərə əmr etdi." İsra 22-23**

**Uca Allah, bu və bunun kimi bir çox ayələrdə, batıl ilahların varlığını bizlərə xəbər verib, onların üluhiyyətdə heç bir paylarının olmadığını bəyan etmişdir. Yəni onların ibadətə layiq olmadıqlarını bildirmişdir. Demək ki, Lə iləhə illə Allahın mənası, onların mövcudluğunu inkar etmək deyil, məs onların ibadətə layiq olmayan batil ilahlıqlarını inkar etməkdən ibarətdir. Çünki, ilahlar mövcuddur, ancaq Ondan başqa ibadətə layiq ilah toxdur. Haqqı çatan ilah sadəcə**

**Allahdır. O halda bu kəlmənin mənasını ya "Allahdan başqa ibadətə layıq məbud yoxdur. "kimi başa düşünməliyik, ya da "Allahdan başqa ibadətə layıq haqqı çatan ilah yoxdur. "kimi anlamalıyıq.**

**"Allahdan başqa ibadətə layıq haqqı çatan məbud yoxdur." Cümləsi feeli bir cümlə deyildir. Əksinə hökm ilə əlaqəli bir cümlədir. Bu cümləni bir şəxs dili ilə söylədiyində, onun ilk olaraq etdiyi əməl; Allahdan başqa hər ibadət edilən şeyi və ya kəsi rədd etməkdən ibarət olur. Və ibadəti yalnız Allaha xaslaşdırır . Deməк ki, Lə iləhə illə Allahın mənası budur. Və bu kəlmə bu şəkildə və bu mənaya uyğun olaraq tərcümə edilməlidir.**

**Bu xətanın əsli, onların, Kəlam əhlinin təfsirinə tabe olmalarıdır. Onlar "Allahdan başqa heç bir ilah yoxdur." Deyərkən " Allahdan başqa heç bir yaradıcı yoxdur "mənasını qəst etməkdə olurlar . Çünki onlara görə ilah, yaradan mənasına gəlir.**

**Bu məsələnin qrammatik tərəfdən incələnməsinə gəlsək; Lə iləhə illə Allahın tərcümədə "Allahdan başqa heç bir ilah yoxdur. "kimi tərcümə edən adam şübhəsiz ki xəta etmişdir. Çünki Elim əhlinin də ifadə etdikləri kimi, bu cümlənin təhlilində (erabında), düşmüş olan xəbər sözü "haqq"dır. Əsrimizin ən böyük alimlərindən olan, Şeyx Saleh bin Fəvzan əl Fəvzan bu barədə buyurur: "Alimlər Lə iləhə illə Allahın təhlilinə fikir vermişlər və onu bu cür təhlil etmişlər: (لا) "Lə" bütün cinsin inkarıdır. (اله) "ilah" onun ismidir və fəthə üzəridə məbnidir. Xəbəri düşmüşdür. Düşən xəbər isə təqdirdə olan (حق) "haqq" kəlməsidir. Yəni, haqqı çatan ilah yoxdur. (ال الله) illə Allah isə raf halında olan mərfu bir isimdir. Və istisna olandır."**

**Lə iləhə illə Allahın mənası Azərbaycan dilində "Allahdan başqa ibadətə haqqı çatan ilah yoxdur. "kimi tərcümə edilməlidir. Bu kəlməni, "Allahdan başqa ilah yoxdur" kimi tərcümə etmək , batil ilahların varlığını inkar etmək mənasına gəlir. Bu cür tərcümə də həqiqətə müxalif olduğu üçün, hər hansı bir mənaya gəlmir. Demək ki,**

**Ərəb dilində düşən xəbər, Azərbaycan dilinə tərcümədə istifadə olunmalıdır. Azərbaycan dilinə tərcümədə bu xəbərin gizli qalması insanların, bu mənadan cahil qalmalarına səbəb olmuşdur. Bu səbəbdən də Lə iləhə illə Allahın mənasını olduğu kimi tərcümə etmək və insanlara bəyan etmək çox önəmli məsələlərdəndir.**

**Türkiyədə yaşayan elim tələbəsi: Hüseyn Cinislinin (Allah onu hifz etsin və bu dəvətində sabit etsin) bu şərhə verdiyi təfsilat.**

**3- Cəhmiyyə, Mötəzilə** və onların Yoluna tabe olanların Tövhid Kəlməsinə verdikləri təfsir isə belədir;

Onlara görə bu kəlmənin mənası Allahın isim və sifətlərini inkar etməkdir. Çünki onlara görə isim və sifətləri isbat edən kəs müşrik sayılır. Onlara görə tövhid, isim və sifətləri inkar etməkdir.

**4- Günümüzdəki Hizbiçilər və İxvanların** Tövhid Kəlməsinə verdikləri təfsir isə belədir;

Onlara görə "Lə iləhə illə Allahın" mənası Hakimiyyətin yalnız Allaha aid edilməsidir. Onların hakimiyyət ismini verdikləri təfsir isə, əslində "Lə iləhə illa Allahın" mənasından bir hissəni əhatə edir. Halbuki "Lə iləhə illa Allahın", ibadətin hər cür şəklinin cəmini əhatə edir. Onlardan soruşuruq: O zaman bəs ibadətin qalan növləri haradadır? Haradadır Ruku, səcdə, Qurban, Nəzir və sairə ibadətlər? Bəs digər ibadətlər haradadır?

Əgər "Lə iləhə illə Allahın" mənası sizə görə sadəcə hakimiyyətdirsə, bəs onda şirkin digər çeşidləri haradadır onlardan nədən danışılmır? Bu səbəbdən də bu məsələlərdə ayıq-sayıq olmaq lazımdır. Çünki bu kəlimə əzəmətlidir. Onu

həqiqi mənada öz həyatlarına tətbiq edənləri oddan xilas edən bir kəlmədir. Dinin əvvəli və sonu məhz bu kəlmə ilə bina edilmişdir. Rəsulların dəvətləri və kitabların hamısı bu kəlmə ilə sabitdir. Bil ki, Əhli sünnətin Tövhid kəlməsinə verdikləri təfsir bu cürdür; Allahdan başqa haqq məbut yoxdur. Çünki məbudlar çoxdur. Ancaq haqqı çatan məbud yalnız Allahdır. Ondan başqasına olunan ibadət batildir.

Necəki uca Allah buyurur:

**"Şübhəsiz ki bu belədir! Çünki, Allah haqqın özü, ondan başqa çağırdıqlarınız isə batildir. Həqiqətən də Allah çox uca və böyükdür." Həcc 62**

---

**Mətin:**

فاعلم: أن هذه الألوهية، هي التي تسميها العامة، في زماننا: السر، والولاية

**"Bil ki zamanımızdakı avamların üluhiyyətə verdikləri isim, "sirr və vilayətdir."**

---

**Şərh:**

Yəni onlar, övliyalara iman və etiqad edirlər: "Bu övlüyada gizliləri bilmək və vilayətin olduğuna etiqad edirlər." Daha sonra isə o övliyaya qurbanlar kəsilir, dualar edilir, kömək istəlinilir və ona yaxınlaşmağa çalışılır. Çünki onda sırr və vilayət vardır.

---

**Mətin:**

**فالإله معناه: الولي الذي فيه السر؛ وهو الذي يسمونه: الفقير، والشيخ**

**Deməkki ilahın mənası sirri olan vəlidir. O şəxs həmçinin də Fəqir və ya Şeyxdə adlandırılır.**

---

**Şərh:**

Sufilər abidi, Şeyx olaraq adlandırırlar. Yəni dinlərini onlara öyrədən şəxsə şeyx ismini verirlər. Öz dinini Şeyxindən öyrənən kişiyə də onun müridi deyirlər. Bunların arasındakı münasibət, meyyid yuyanla, meyidin arasında olan əlaqəyə bənzəyir. Belə ki mürid şeyxinə heç bir halda etiraz edə bilməz.

---

**Mətin:**

**وتسمية العامة: السيد، وأشباه هذا؛**

**Və avamların onlara verdiyi adlar  Seyyid və sairə bunun kimi isimlər olur.**

---

**Şərh:**

Onlar müəllimlərini "Seyyid və ya Şeyx" deyərək isimləndirirlər. Və həmin Seyyidlərinə mütləq beyyət və onun əmrinə təslim olmağı vacib sayılır. O şeyxə heç bir halda etiraz və hər hansı bir məsələdə müxaliflik edə bilməzsən. Əks təqdirdə sən onun müridi ola bilməzsən.

---

**Mətin:**

**وذلك: أنهم يظنون، أن الله جعل لخواص الخلق عنده منزله، يرضى أن الإنسان يلتجىء إليهم، ويرجوهم، ويستغيث بهم، ويجعلهم واسطة بينه، وبين الله**

**Və bununla da onlar elə zənn edirlər ki, Allah onu (övlüyanı) öz nəzdində xüsusi məqam sahibi etmişdir. Və insanların ona yönəlməsinə, ondan yardım istəmələrinə Allahın razılığı vardır. Və Allah özü onu, insanlarla özü arasında vasitə etmişdir.**

---

**Şərh:**

Onlar belə deyirlər: "Allah özü ilə insanlar arasında şəfaətçilər və insanları Allaha yaxınlaşdırsınlar deyə, xüsusi şəxslər təyin edərək seçmişdir. Onlara yalvarmağı və onlara sığınmağı, onlardan yardım istəməyi də icazəli etmişdir."

Onların təqib edib izlədikləri yolları və etiqadları budur. O kəslər ibadət etdiklərində: "Bunlar Allahın şərikləridir."

Deməzlər, əksinə "bunlar Allah nəzdində bizim şəfaətçilərimizdir və bunlar bizləri Allaha yaxınlaşdırırlar. Çünki Allah onları, saleh əməlləri və təqvaları səbəbi ilə seçmişdir. Və beləcə də onlar Allahla insanlar arasında vasitələr olmuşlardır."

Allah onların söylədiklərindən heç şübhəsiz münəzzəhdir. Bütün bu səbəblərdən bu kimsələr şeyxləri ölü və ya diri olmasından asılı olmayaraq, onlara ibadətlə yaxınlaşmağa çalışırlar. Və deyərlər ki; "Seyidlərə yaxınlıq edənlər, Allaha yaxınlıq edənlər kimidirlər. Hər kim şeyxinə yaxınlaşmağa çalışarsa, əslində Allaha yaxınlaşmağa çalışandır."

Uca Allah buyurur:

**"Allahdan başqa nə bir xeyir və nə də bir zərər verməyə qadir olmayanlara ibadət edənlər deyərlər; "Bunlar bizim Allah nəzdindəki şəfaətçilərimizdir." Yunus 18**

Bu həddə çatmağa belə şeytan onları sövq edə bilmişdir. Allahım mustəən.

---

**Mətin:**

**فالذي يزعم أهل الشرك في زماننا: أنهم وسائطهم؛ هم: الذين يسميهم الأولون، الإله، والواسطة هو الإله**

**Günümüzün "Şirk Əhlinin" vasitəçilər adlandıraraq zənn etdiklərini, əvvəlkilər "ilah" olaraq adlandırmışlar. Deməl ki, "vasitələr" əsil ilahların özüdür.**

---

**Şərh:**

Əvvəlki müşriklər o ibadət etdiklərini "ilahlar" deyərək adlandırırdılar. Bu səbəbdən də Rəsulullah ﷺ onlara "Lə iləhə illə Allah" dediyində, onlar:

**"İlahlarımızı tək bir ilah mı etmək istəyirsən? Doğrusu bu çox təcüblü bir şeydir!"** Necə bunu Uca Allah onların adından, öz kitabında buyurur.

Və onların başinda duranları isə belə dedilər:

**"Gedin öz ilahlarınıza (ibadətdə) sabat (möhkəm) olun! Şübhəsiz bizə lazım olan şey budur!" Sad 5-6**

Göründüyü kimi o müşriklər onları ilahlar olaraq adlandırıdılar.

**"Onlar dedilər: İlahlarınız olan vəddi, suvadı, yağusu, yauqu və nəsri, heç vaxt tərk etməyin!" Nuh 23**

Bəli! Şübhəsiz ki, əvvəlkilər onları "ilah" deyərək adlandırırdılar. Özlərini islama nisbət etdiklərini iddia edən sonrakilər (müşriklər) isə onları "şəfatəçilər və vasitələr" deyərək adlandırdılar və onlara heç vaxt ilah adını vermirlər. Lakin adlar dəyişsə də, məna eynidir. Çünki kəlmələrin dəyişməsi həqiqəti, heç vaxt dəyişdirməz.

---

**Mətin:**

**فقول الرجل: لا إله إلا الله، إبطال للوسائط**

**Deməli (günümüzdəki) kimsələrin "lə iləhə illə Allah" demələri vasitələri batil hesab etmələri üçündür.**

---

**Şərh:**

Deməli, kişinin şəhadət kəlməsini söyləməsində ki məqsədi, Allahla yanaşı və ya ondan başqa ibadət olunanların hamısını, batil hesab etməsidir. İstər O kəs bunları vasitələr və ya şəfaətçilər, istərsə də ilahlar adlandırılsın, bunun heç bir fərqi yoxdur. Lə iləhə illə Allah kəlməsi necə adlanırsa adlansın, əsil olan Allahdan başqa ibadət olunanların batil hesab edilməsi olmalıdır.

---

**Mətin:**

**إذا أردت أن تعرف هذا، معرفة تامة، فذلك بأمرين؛ الأول: أن تعرف أن الكفار الذين قاتلهم النبي صلى الله عليه وسلم، وقتلهم، وغنم أموالهم، واستحل دماءهم، وسبى نساءهم، كانوا مقرين لله: بتوحيد الربوبية؛ وهو أنه لايخلق إلا الله، ولا يرزق، ولا يحيي، ولا يميت، ولا يدبر الأمر إلا الله، كما قال تعالى: (قل من يرزقكم من السماء والأرض أمن يملك السمع والأبصار ومن يخرج الحي من الميت ويخرج الميت من الحي ومن يدبر الأمر فسيقولون الله فقل أفلا تتقون)يونس: 31 .**

**Əgər sən bu məsələni tam bir şəkildə bilmək istəyirsənsə, bunun öyrənilməsi iki şəkildə mümkündür.**

**-Birincisi; Bilməlisənki, Rəsulullahın ﷺ vuruşduğu, mallarını qənimət götürdüyü, qanlarını halal hesab etdiyi və qadınlarını əsir aldığı o kafir olan kəslər Rübubiyyət Tövhidini etiraf (etiqad) edirdilər. Və etiqad edirdilər ki, Allahdan başqa yaradan, ruzi verən, öldürən və diriltən və kainatdakı işləri idarə edən yoxdur.**

**Necə ki, bunu Uca Allah öz kitabında buyurur;**

**"(Ey Muhəmməd ﷺ onlara) De: "Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan (onları yaradan) kimdir? Ölüdən diri, diridən ölü çıxaran kimdir? İşləri idarə edən kimdir? Onlar: (yəni müşriklər) Allahdır deyəcəklər." Yunus 31**

---

**Şərh:**

Günümüzdəki "Quburilər" (yəni qəbirlərə ibadət edənlər) bir insan Allahı yaradan, ruzi verən, öldürən və diriltən və işləri idarə edən olduğuna etiqad edərsə, müsəlman olduğunu bildirirlər. Əgər bu belədirsə bəs onda "Lə iləhə İllə Allah" şəhadətinin mənası nədir? Deməli onlar üçün bu kəlmənin heç bir mənası yoxdur! Çünki o zamanın müşrikləri də bu şeyləri söyləyirdilər.

---

***Mətin:***

**وهذه: مسألة عظيمة، مهمة؛ وهي: أن تعرف أن الكفار شاهدون بهذا كله، ومقرون به، ومع هذا لم يدخلهم في الإسلام، ولم يحرم دماءهم، وأموالهم؛ وكانوا أيضا: يتصدقون، ويحجون، ويعتمرون، ويتعبدون، ويتركون أشياء من المحرمات، خوفا من الله عزَّ وجلَّ.**

**Və bu doğrudan da çox əzəmətli və barəsində düşünüləcək mühüm bir məslədir. O da, o dövrün kafirlərinin bütün bu sadaladıqlarımıza şəhadət gətirmələri və bunları təsdiq etmələrinə baxmayaraq <u>islama daxil olmamaları, qanlarının və mallarının haram olunmamasıdır</u>. Baxmayaraq ki, onlar bununla yanaşı  sədəqələr verir, həcc və ümrə edir, müxtəlif ibadətlər edirdilər. Həmçinin də bəzi haram olan işləri məhz <u>Allah qorxusu</u> səbəbindən tərk etmişdilər.**

---

**Şərh:**

Bu, həqiqətəndə əzəmətli və olduqca mühüm olan bir məsələdir. Lakin təsüflər olsun ki, bu məsələyə diqqət verənlər olduqca azdırlar. Çünki onlar, insanın Rübubiyyət tövhidini iqrar (təsdiqləməklə) etməklə müsəlman olduğunu bildirirlər. Halbuki o dövrün müşrikləri də, Rübubiyyət tövhidini iqrar edirdilər. Bu iqrarları ilə yanaşı sədəqə, həcc kimi ibadətləri də  edirdilər.

Onlar həcc və ümrə edirdilər və "Allahdan başqa ruzi verən, öldürən və dirildən yoxdur" deyirdilər. Rübubiyyət tövhidini də iqrar edirdilər və bəzi ibadət çeşidləri ilə də ibadət edirdilər. Ancaq onlar, ibadəti xas olaraq Allaha sərf

etmirdilər. Həm Allaha, həm də onunla yanaşı başqalarına ibadət edirdilər və bu da onları müşrik edirdi.

---

**Mətin:**

**ولكن الأمر الثاني، هو: الذي كفرهم، وأحل دماءهم، وأموالهم؛ وهو: أنهم لا يشهدون الله بتوحيد الألوهية**

**Və Lakin ikinci məslə də vardır. Və məhz bu məsələ, onların təkfir olunmalarına (kafir olmalarına), canlarını və mallarını halal olmasına səbəb olmuşdur. Bu da onların Allaha Üluhiyyət tövhidin də şəhadət gətirməmələri idi.**

---

**Şərh:**

Çünki tələb olunan məhz bu Üluhiyyət tövhididir. Yəni, Allahı ibadətdə təkləşdirmək. Lakin tələb olunan yalnız Üluhiyyət tövhidi deyil. Əksinə Allahı hər iki tövhid növündə də təkləşdirmək vacibdir. Rübubiyyət tövhidi vacibliyi özü-özlüyündə Üluhiyyəti gərəkli edir. Üluhiyyətin vacibliyi də həmçinin, Rübubiyyəti gərəkli edən və onu öz içinə alan

vaciblərdəndir. İkisindən yalnız biri olarsa bu, özü-özlüyündə sənə heç bir fayda verməbilməz.

---

**Mətin:**

**وهو أنه: لا يدعى إلا الله، ولا يرجى إلا الله وحده لا شريك له،**

**Bu da (Üluhiyyət tövhidi) tək və heç bir şəriki olmadan uca Allaha yalvarıb yaxarmaq və yalnız ona yönəlməkdən ibarətdir.**

---

**Şərh:**

Yəni Üluhiyyət Tövhidi bütün ibadət növlərini özündə cəm edir. Bu ibadətlərdən bir şeyi belə Allahdan başqasına yönəltməməkdən ibarətdir. Çünki bunlara haqqı çatan yeganə varlıq sadəcə Odur. Hər kim bu ibadət növlərindən birini belə Allahdan başqasına yönəldərsə, şəhadət gətirsə belə, hətta bir çox ibadətlərlə Allaha ibadət etsə belə, O şəxs müşrikdir. İbadətlərin hamısını xas olaraq, yalnız Allaha yönəldənə qədər O şəxs, müsəlman deyildir.

---

***Mətin:***

**ولا يستغاث بغيره، ولايذبح لغيره، ولا ينذر لغيره، لا لملك مقرب، ولا نبي مرسل، فمن استغاث بغيره، فقد كفر، ومن ذبح لغيره، فقد كفر، ومن نذر لغيره، فقد كفر؛ وأشباه هذا.**

**Ondan başqasından kömək istəmək olmaz. Ondan başqasına qurban kəsmək olmaz. Ondan başqasının adına nəzir edilmək olmaz, istər bunlar ən yaxın mələk və ya ən fəzilətli rəsul olsun, yenə də bu heç nəyi dəyişdirməz. Kim Allahdan başqasından (yalnız Allahın qadir olduğu bir şeydə Ondan başqasından) kömək istəyərsə kafir olar. Kim Allahdan başqasına qurban kəsərsə, kafir olar. Kim Allahdan başqasının adına nəzir edərsə, Kafir olar. Və digəri də (ibadətlər də) bunun kimidir.**

---

**Şərh:**

Yəni bu ibadətlərdən birini Allahdan qeyrisinə yönəldərsə, "Lə iləhə illə Allah" deyərsə belə kafir olar. Çünki O "Lə iləhə illə Allah" kəlməsinin ziddi olan şeyləri edir.

-Necə O "Lə iləhə illə Allah" deyir ki, Allahdan başqasına qurban kəsir?

-Necə O "Lə iləhə illə Allah" deyir ki, Allahdan başqasından: Ölülərdən, qeybdən olanlardan, cinlərdən və şeytanlardan kömək istəyər?

-Necə olur ki O, həm "Lə iləhə illə Allah" deyir, həmdə Allahdan qeyrisinin adına nəzir edir?

Bütün bu əməllər o şəhadət kəlməsi ilə ziddiyyət təşkil edən şeylərdir.

***Mətin:***

وتمام هذا: أن تعرف أن المشركين، الذين قاتلهم رسول الله صلى الله عليه وسلم كانوا يدعون الملائكة، وعيسى، وعزيراً، وغيرهم من الأولياء، فكفرهم الله بهذا، مع إقرارهم بأن الله هو الخالق، الرازق، المدبر؛

**Və bunun tamamı isə, sənin bilməli olduğun bu məsələ ilə mümkündür: Bil ki Rəsulullahın ﷺ vuruşduğu müşriklər, mələklərə, İsaya ﷺ , Üzeyirə və digər övliyalara dualar edirdilər. Və onların Allahı yaradan, ruzi verən və işləri idarə edən olduğunu iqrar etmələrinə baxmayaraq, Allah onları etdikləri bu əməllərə görə təkfir etmişdir.**

---

**Şərh:**

Bilinməlidir ki, əvvəlki müşriklərin hamısı bütlərə ibadət etmirdilər. Onlar öz ibadətlərində müxtəlif qruplara ayrılmışdılar. Onlardan bəziləri bütlərə, bəziləri mələklərə, bəziləri rəsullara, bəziləri isə salehlərə ibadət edirdilər. Lakin Rəsulullah ﷺ onların arasinda heç bir fərq qoymadan onların hamısı ilə eyni şəkildə vuruşdu. Rəsulullah: ﷺ “Mən sadəcə bütlərə ibadət edənlərlə vuruşacağam” deyərək Üzeyirə, Məsihə və digər salehlərə ibadət edənləri tərk etmədi. Əksinə onların arasında heç bir fərq qoymadı.

Günümüzdəki quburilər belə buyururlar: “Şirk, bütlərə ibadət etməkdir. Övliyalara ibadət, onların vasitəsi ilə Allaha

yaxınlaşmaq və onlar ilə Allaha təvəssül etmək şirk deyildir."

Ya SübhənAllah! Rəsulullah ﷺ onlara fərq qoymadan hamısı ilə birlikdə vuruşdu. Bütlərə ibadət edənlər ilə, mələklərə ibadət edənlər ilə, Məsihə ibadət edənlər ilə, Üzeyirə ibadət edənlər ilə, övliya və salehlərə ibadət edənlər arasında heç bir fərq qoymadan, onların hamısı ilə vuruşdu. Çünki həqiqətdə onların arasında heç bir fərq yoxdur.

---

**Mətin:**

**فإذا عرفت: معنى لا إله إلا الله؛ وعرفت: أن من نخا نبيا، أو ملكا، أو ندبه، أو استغاث به، فقد خرج من الإسلام، وهذا هو الكفر، الذي قاتلهم عليه رسول الله صلى الله عليه وسلم.**

**فإن قال قائل من المشركين: نحن نعرف أن الله هو الخالق، الرازق، المدبر؛ لكن هؤلاء الصالحين: مقربون، ونحن ندعوهم، وننذر لهم، وندخل عليهم، ونستغيث بهم، نريد بذلك الجاه، والشفاعة، وإلا فنحن نفهم: أن الله هو المدبر؛ فقل: كلامك هذا، دين أبي جهل، وأمثاله**

**Və əgər sən bu "Lə iləhə İllə Allahın" mənasını öyrəndinsə, deməkki sən, həmçinin də bir Nəbidən və Mələkdən kömək istəyənlərin və onlara yalvararaq sığınanların, İslam dinindən çıxdığını bilmiş oldun. Həmçinin də Rəsulullahın ﷺ mücadilə apardığı küfrün də, məhz bu olduğunu öyrənmiş oldun.**

**Əgər bu müşriklərdən biri:**

**"Bilirik ki, yaradan, ruzi verən, işləri idarə edən Allahdır. Lakin o kimsələr Allaha yaxin olan salehlərdir. Bizlər onlara dualar edirik, onlara nəzirlər edirik, onlara sığınırıq, onlar ilə (vəsilə tutaraq) kömək istəyirik . Bütün bunlarla istədiyimiz sadəcə onların məqamı və onların (Allah nəzdində bizim üçün) şəfaətçi olmalarıdır. Yoxsa ki, biz əlbəttə ki, anlayırıq ki, bütün işlər yalnız Allahın izni ilə olur."**

**O zaman ona de ki, bu dediklərin (heç şübhəsiz) Əbu Cəhlin və onun mislində olanların dinidir.**

---

**Şərh:**

Salehlərdən kömək diləməyin və onlar ilə təvəssül etməyin şirk olduğunu qəbul etməyənlər deyirlər:

"Bizim məqsədimiz təvəssüldür (vasitəçilik)"

Biz isə onlara deyirik;

"Sənin bu dediklərin Əbu Cəhil, Əbu Ləhəb və onların bənzərlərinin yoludur. Çünki onlar da Allahdan başqa yaradan, ruzi verən, öldürən və diriləldən, işləri idarə edən yoxdur deyirdilər və bu ilahlara; "bizləri Allaha yaxinlaşdırsınlar deyə" ilah etdiklərini bildirirdilər.

Necəki Uca Allah bu barədə buyurur:

**"Onlar Allahı qoyub özlərinə nə xeyir, nə də bir zərər verə bilməyənlərə ibadət edir və bunlar bizim Allah yanında şəfaətçilərimizdir deyirlər. De! yoxsa sizlər Allahın göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz." Yunus 18**

---

***Mətin:***

فهم يدعون: عيسى، وعزيراً، والملائكة، والأولياء، يقولون: (مانعبدهم إلا ليقربونا إلى الله زلفى) [الزمر: 3] وقال: (ويعبدون من دون الله مالا يضرهم ولا ينفعهم ويقولون هؤلاء شفعاؤنا عند الله) [يونس: 18].

**Çünki onlarda İsaya, Üzeyirə, mələklərə övliyalara dualar edərək belə deyərdilər:**

**" Biz bunlara yalnız bizləri Allaha yaxınlaşdırsınlar diyə qulluq edirik." Zümər 3**

**Yenə Onlar**

**"Onlar Allahı qoyub özlərinə nə xeyir, nə də bir zərər verə bilməyənlərə ibadət edir və bunlar bizim Allah yanında bizim şəfaətçilərimizdir deyirlər."**

---

**Şərh:**

Əvvəlki müşriklər, Allahla özləri arasında ibadət etdiklərinə, sadəcə vasitələr kimi baxırdılar. Onların yaradan və ya ruzi verən olduğunu da heç vaxt söyləmirdilər: **"Bunlar sadəcə bizim Allah nəzdində şəfaətçilərimizdir"** və ya **"Bu Allahı Ucaltmağın bir vasitəsidir"** deyirdilər.

---

**Mətin:**

فإذا تأملت هذا تأملاً جيداً، عرفت: أن الكفار يشهدون لله بتوحيد الربوبية، وهو التفرد بالخلق، والرزق، والتدبير، فهم ينخون عيسى، والملائكة، والأولياء يقصدون: أنهم يقربونهم إلى الله زلفى، ويشفعون لهم عنده؛ وعرفت: أن الكفار، خصوصاً النصارى؛ منهم: من يتعبد الليل، والنهار، ويزهد في الدنيا، ويتصدق بما دخل عليه منها، معتزلا في صومعة عن الناس، ومع هذا: كافر، عدو لله، مخلد في النار، بسبب اعتقاده في عيسى، أو غيره من الأولياء، يدعوه ويذبح له، وينذر له؛

**Bütün bunları gözəl bir şəkildə düşünsən, kafirlərin Rübubiyyət tövhidini Allah üçün isbat etdiklərini anlayarsan. Və bu da (Rübubiyyət Tövhidi) Allahı yaramaqda, ruzi verməkdə, işləri idarə etməkdə təkləşdirməkdir. Onların İsaya, mələklərə və övliyalara (timsallarının qarşısında) əyilmələrindəki məqsədləri, onları (müşrikləri) Allaha yaxınlaşmaq və Allah nəzdində onlar üçün şəfaətçi olmaları üçündür.**

**Həmçinin də anladın ki: Kafirlər, xüsusən də Xristianlardan bir qrup, gecə-gündüz Allaha ibadət edir, dünyanı tərk edərək zahidliklə məşqul olurlar. Və dünyadan nəsibləri olan şeyləri də insanlardan gizlində, onlardan çəkinə-çəkinə (görməsinlər deyə) Allah üçün sədəqə edərlər.**

**Və bütün bu əməllərinə baxmayaraq onlar kafirdirlər və cəhənnəmdə əbədi qalacaqlar. Bunun səbəbi isə onların Məryəm oğlu İsaya və digər Allah dostlarına qarşı etdikləri etiqadlarıdır. Həmçinin onlar üçün qurban kəsmələri və onların adi ilə nəzir etmələridir.**

Şərh:

Xristian keşişləri kilsələrdə gecə-gündüz ağlayaraq ibadət edərlər. Yalnız buna baxmayaraq onlar "Məsih Allahın oğludur" və ya "Allah Məryəm Oğlu Məsihin özüdür" deyərək etiqad edərlər. Bəli onlar ağlayırlar, ibadətlər edirlər, yalnız bütün bunların onlara bir faydası yoxdur. Çünki onlar öz ibadətlərini, Aləmlərin Rəbbi olan Allaha xas olaraq, yalnız onun üçün etmədilər. Günümüzdəki quburilərin (qəbirlərə ibadət edənlərin) də halları onların halı kimidir.

---

***Mətin:***

**تبين لك كيف صفة الاسلام الذي دعا اليه نبيك محمد صلى الله عليه و سلم**

**وتبين لك: أن كثيرا من الناس عنه بمعزل؛ وتبين لك: معنى قوله صلى الله عليه وسلم: " بدأ الإسلام غريباً، وسيعود غريبا كما بدأ " .**

**Artıq sənin nəbin olan Rəsulullahın ﷺ dəvət etdiyi İslamın əsil simasının necə olduğu, sənə bəyan oldu. Həmçinin də insanların çoxunun o İslamdan uzaq olduqları da, artıq sənə bəyan oldu. Və ən əhəmiyyətlisi də Rəsulullahın bu sözünün mənası da, artıq sənə bəyan oldu!**

**"İslam qərib olaraq gəldi və qərib olaraq, başladığı kimi də geri dönəcəkdir."**

---

Şərh:

Bəli Səhih olan islam günümüzdə qəribdir. Amma iddia olunan islama (müsəlman olduqlarını iddia edənlərə) və müsəlmanlara (iddiaçılara) gəlincə, bu gün onların sayı milyardı keçməkdədir.

Əgər bu milyard müsəlmanın İslamı səhih olsaydı, onların qarşısında dünyada heç kəs dura bilməzdi!!! Lakin səhih İslam gəribdir.

Sən hələ yəhudilərə bir bax! Üzərlərinə zillət və alçaqlıq çökmüş olan, donuzların və meymunların qardaşları olan, o alçaq yəhudilər, bu gün müsəlmanların torpaqlarında, onların üzərində ağlıq etməklə məşquldurlar.

O dövrün müsəlmanlar "Bədir" döyüşündə Rəsulullahın ﷺ yanında olduqlarında, üç yüzdən on kişi az idilər. (yəni 290).

-Lakin onlar Bədirdə nələr etdilər?

-Səhabələrə baxın! Yer üzərindəki insanlar ilə müqayisədə sayca onlar neçə nəfər idilər?

Lakin bununla yanaşı onlar ölkələri fəth etdilər. Kisralıları və Qayseriləri məğlub etdilər. Bütün yer üzündəki insanları təşvişə saldılar. Və yer üzünün ağaları oldular. Çünki onların islamı, boş bir iddia deyildi. Çünki onlar, səhih bir islam etiqadına idilər. Onların islamı səhih idi.

---

**Mətin:**

فالله، الله، إخواني: تمسكوا بأصل دينكم أوله وآخره، اسه ورأسه، وهو: شهادة أن لاإله إلا الله؛ واعرفوا: معناها؛ وأحبوا أهلها، واجعلوهم إخوانكم، ولو كانوا بعيدين؛ واكفروا بالطواغيت، وعادوهم، وابغضوا من أحبهم، أو جادل عنهم، أو لم يكفرهم، أو قال ماعلي أو منهم، قال ماكلفني الله بهم، فقد كذب هذا على الله، وافترى؛ بل: كلفه الله بهم، وفرض عليه الكفر بهم، والبراءة منهم؛ ولو كانوا: إخوانه، وأولاده؛ فالله، الله، تمسكوا بأصل دينكم، لعلكم تلقون ربكم، لا تشركون به شيئا؛ اللهم توفنا مسلمين، وألحقنا بالصالحين. ولنختم الكلام: بآية ذكرها الله في كتابه، تبين لك: أن كفر المشركين، من أهل زماننا، أعظم من كفر الذين قاتلهم رسول الله صلى الله عليه وسلم

**Allah! Allah! : Ey Qardaşlarım! Dininizin əsasına, onun əvvəli, axırı, təməli və başı olan Lə iləhə illə Allah şəhadətinə sım-sıx sarılın. Mənasını öyrənin. Onu da əhlini də sevin və bu kəlmənin əhlini, uzaqlarda olsalar belə Qardaşlar edin. Tağutlara küfr edin. Onlara düşmənçilık göstərib, buğz edin. Və hara da olsanız, tağutları sevənlərə və ya onlar üçün mücadilə edənlərlə və ya onları təkfir etməyənlərə və ya "onlardan mənə nə?" və ya "Allah məni bu əməllər ilə mükəlləf etməyib" deyənlərə buğz (nifrət və ədavət) edin. Belələri Allah haqqında yalan söyləyrək Uca Allaha iftira atanlardır. Əksinə Allah Onu, bu işlərdə mükəlləf etmış və bununla kifayətlənməyib, onları inkar (küfr) etməyi, qardaşları və uşaqları olsalar belə, onlardan uzaqlaşmağı fərz etmışdır.**

**Ey qardaşlarım! Bütün bu deyilənlərdən azı dişləriniz ilə yapışın! Umulur ki, belə olsanız Rəbbinizə, şirk qoşmamış**

**kimsələr olaraq qovuşarsınız. Allahım, canımızı Müsəlman olaraq al və bizləri salehlərdən et!**

**Sözümü Allahın kitabında zikr etdiyi bir ayəsi ilə tamamlayacağam. Və bununlada zamanımızın müşriklərinin küfrünün, Rəsulullahın dövründəki, özləri ilə də vuruşduğu müşriklərin küfürlərindən daha da əzəmətli olduğu sənə aydın olacaq.**

---

**Şərh:**

**Bəli, zamanımızdakı müşriklərin küfrü öncəki müşriklərin küfründən daha da böyükdür. Yəni günümüzün müşriklərinin küfrü, Əbu Cəhilin, Əbu Ləhəbin küfründən daha böyük küfürdür.** Çünki, öncəkilərin şirkləri sadəcə rahatlıq anlarında idi. Onlara bir çətinlik üz verdiyində, yalnız Allaha yönəlib, Onu çağırırdılar. Çünki, bilirdilər ki, bu çətinliyi onlardan yalnız Allah uzaqlaşdıra bilər. Zamanımızın müşriklərinin çətin anlarında etdikləri şirkləri, rahatlıqda edilən şirklərdən daha çoxdur. Onlara bir bəla üz verən kimi, öz məbudlarına nida edərək onlara yalvarırlar. Yəni dənizdə boğulmaqdan qurtulmaq üçün Allaha yox, öz məbudlarına səslənərlər. Və hər çətinlikdə də eyni cür hərəkət edərlər. Çətinlik artdıqca şirkləri də artar. Həqiqətən də bunlar öncəki müşriklərdən daha betərdirlər.

---

***Mətin:***

، قال تعالى: (وإذا مسكم الضر في البحر ضل من تدعون إلا إياه) الآية الإسراء: 67 فقد ذكر الله تعالى، عن الكفار، أنهم إذا مسهم الضر، تركوا السادات، والمشائخ، فلا يدعونهم، ولا يستغيثون بهم؛ بل يخلصون لله وحده، لا شريك له، ويستغيثون به، ويوحدونه؛ فإذا جاء الرخاء: أشركوا.

وأنت ترى المشركين من أهل زماننا، ولعل بعضهم يدعي أنه من أهل العلم، وفيه زهد، واجتهاد، وعبادة؛ وإذا مسه الضر، يستغيث بغير الله، مثل: معروف؛ وعبد القادر، الجيلاني؛ وأجل من هؤلاء، مثل: زيد بن الخطاب، والزبير؛ وأجل من ذلك، مثل: رسول الله صلى الله عليه وسلم فالله المستعان؛ وأعظم من ذلك، وأعظم: أنهم يستغيثون بالطواغيت، والكفرة، المردة، مثل: شمسان؛ وإدريس، ويوسف، وأمثالهم

والله أعلم.

**Uca Allah buyurur: “Sizə dənizdə bir çətinlik üz verdiyində Allahdan başqa çağırdıqlarınız qeyb olar. Biz sizləri qurtarıb sahilə çatdırdığımız zaman isə üz döndərərsizniz. Həqiqətəndə insan çox nankordur.” İsra 67**

**Uca Allah bizlərə o Kafirlərə bir zərər verdiyinidə, həmən tutunduqları şeylərini tərk edib, onları çağırmadıqlarını və ibadətlərini yalnız Allaha xas etmələrini, Ondan kömək istədiklərini, onlara rahatlıq gəldiyində isə, Allaha şərik qoşduqlarını xəbər verir.**

**Günümüzün müşrikləri isə sənin də müşahidə etdiyin kimi hətta, bəzilərinin özlərini elim, ictihad, zuhd və ibadət əhli olduqlarını iddia etmələrinə baxmayaraq, başına bir iş gəldiyində həmən, Mərufdan və ya Abdulqadir Ceylanidən və ya bunlardan daha üstün olan Zeyd Bin Əl Xəttabdan və ya**

**Zübeyirdən və bunların hamısından üstün olan Rəsulullahda ﷺ kömək istəyərlər. Allah bizə kömək olsun.**

**Bütün bunlardan da (şirk olaraq) dəhşətlisi və əzəmətlisi də odur ki, Şəmsən, İdris və Yusif kimi tağutlardan və bunlara bənzər, kafirlərdən və hədlərini aşmiş mürtədlərdən kömək istəyərək, yalvarıb yaxarırlar.**

**Allah ən doğrusunu bilәndir.**

---

**Şərh:**

Məruf: Məruf əl Kərhidir. İraqda bilinən övliyalardandır. Quburilər ona ibadət edirlər. Əbdülqadir Jeylani isə, Hənbəlilərin əvvəlki imamlarından olub. Dəyərli bir imamdır. Ancaq dünyasını dəyişəndən sonra onun fayda və zərər verdiyinə etiqad edilməyə başlandı və qəbrinin üzərində türbə tikildi. Sufilər Onu özlərinə və Qədərilər adlanan təriqətçilərə imam etdilər. Allah ona rəhm etsin. Şübhəsiz ki O bunlardan uzaq biridir. O saleh əməlləri, elmi və təqvası ilə bilinən bir adamdır. İmam Əhmədin məzhəbinin böyük şəxsiyyətlərindən sayılan bir imamdır. "Əl Quynə" adlı məşhur kitabın müəllifidir. Zeyd bin əl Xəttab isə çox dəyəri olan bir səhabədir və Ömər bin Xəttabın qardaşıdır. (Allah ikisindən də razı olsun) Yəmamədə öldürüldü, elə qəbirdə oradadır. Qəbrinin üzərində bir türbədə tikilmişdir. Şeyx Muhəmməd bin ƏbdulVəhhab rəhiməhullah, öz dövründə onu yerlə bir etdi və Allaha həmd olsun ki, bu günə qədər də hələ ki tikilmədi. İnşallah bundan sonra da tikilməz!

Zubeyr bin əl Əvvam (Allah ondan razı olsun) Rəsulullahın ﷺ həvarilərindən olmuşdur. Quburilər bu övliyaya və səhabələrə ibadət edirlər. Ancaq bu quburilər bununla kifayətlənməyib, kahinlərə və sehrbazlara ibadət edirlər. Hətta daha da dəhşətlisi: "Əmirləri və qadağaları tərk edən adam, Allaha yaxınlaşan biridir. Əmir və qadağalara ehtiyac yoxdur. Bu şeylər avamlar üçündür. Allaha çatan birisinin bu ibadət və qadağalara ehtiyacı yoxdur." Deyən özbaşına həlulilərdən və ibahilərdən olan bir qrup tağutlara, kafirlərə və hədlərini aşmış azğınlara ibadət edirlər.

Şəmsan, İdris və Yusif kimiləri isə, Şeyxulislamın (Muhəmməd ibn ƏbdulVəhabın) dövründən öncə Riyad şəhərində yaşamış tağutlar idilər. Şeyx Allah yolunda cihada qalxdığı zaman, müsəlmanlar Riyadı ələ keçirdiklərində, onların bütlərini yerlə yeksan etdilər.

Allaha həmd və sənalar olsun.

Muhəmmədə onun əhli beytinə və əshabına və qiyamətə qədər,

onlara gözəl şəkildə tabe olanlara Allahın sılamı olsun.

**Allah! Allah! : Ey Qardaşlarım! Dininizin əsasına, onun əvvəli, axırı, təməli və başı olan Lə iləhə illə Allah şəhadətinə sım-sıx sarılın. Mənasını öyrənin. Onu da əhlini də sevin və bu kəlmənin əhlini, uzaqlarda olsalar belə Qardaşlar edin. Tağutlara küfr edin. Onlara düşmənçilik göstərib, buğz edin. Və hara da olsanız tağutları sevənlərə və ya onlar üçün mücadilə edənlərlə və ya onları təkfir etməyənlərə və ya "onlardan mənə nə?" və ya "Allah məni bu əməllərlə mükəlləf etmədi" deyənlərə buğz (nifrət və ədavət) edin. Belələri Allah haqqında yalan söyləyrək Uca Allaha iftira atanlardır.**
**Əksinə Allah onu, bu işlərdə mükəlləf etmış və bununla kifayətlənməyib, onları inkar (küfr) etməyi;**

**qardaşları və uşaqları olsalar belə, onlardan uzaqlaşmağı fərz etmışdır.**

**Ey qardaşlarım! Bütün bu deyilənlərdən azı dişləriniz ilə yapışın! Umulur ki, belə olsanız Rəbbinizə, şirk qoşmamış kimsələr olaraq qovuşarsınız. Allahım, canımızı Müsəlman olaraq al və bizləri salehlərdən et!**

**Muhəmməd İbn Əbdülvəhab.**